UOT 581.5; 531.4

# QANIX-ƏYRİÇAY VADİSİNİN ALLÜVİAL-ÇƏMƏN VƏ ALLÜVİAL-ÇƏMƏN-MEŞƏ TORPAQLARININ MÜNBİTLİK SƏCİYYƏSİ

**G.R.SARIYEVA**
**Bakı Dövlət Universiteti**

*Qanıx-Əyriçay vadisinin torpaq-bitki komplekslərinin tədqiqi zamanı torpaq-ekoloji səciyyənin verilməsi vacib olduğu üçün bizim tərəfimizdən torpaq tədqiqatları aparılmışdır. Bizim tərəfimizdən hazırlanmış "Qanıx-Əyriçay vadisinin torpaq xəritə-sxemi" əsasında ərazidə yayılmış torpaq yarımtip və növmüxtəlifliklərinin sahəsi hesablanaraq torpaq balansında tutduqları yer müəyyən olunmuşdur. Vadinin kənd təsərrüfatı bitkiləri altında geniş istifadə olunan allüvial-çəmən və allüvial-çəmən meşə torpaqlarının əsas münbitlik göstəricilərinin (humus, azot, udulmuş əsaslar, qranulometrik tərkibi və s.) əsasında müasir münbitlik səviyyəsi müəyyən edilmişdir.*

***Açar sözlər:*** *Qanıx-Əyriçay vadisi, humus, düzən meşələri, münbit torpaq.*

Torpaqların ekoloji vəziyyəti tədqiq edilərkən torpaq örtüyünə ilk növbədə Yer biosferinin, o cümlədən, bütün yer biosenozlarının əvəzedilməz və ən vacib tərkib hissəsi kimi baxılması tələb olunur. Təbii antropogen kompleksin tərkib hissəsi olan torpaq daima hava, su, biogen və texnogen mühitlə qarşılıqlı əlaqədə olur. Bu zaman torpaq antropogen təsirə məruz qalaraq həm özü dəyişilir, həm də kompleksin digər komponentlərinə birbaşa, ya da dolayısı yolla təsir göstərir. Torpağa olan antropogen təsir torpaqəmələgəlmə prosesinə, torpaq orqanizmlərinin yaşaması və fəaliyyət göstərməsinə, enerji və kütlə mübadiləsinə təsir göstərərək ümumi ekoloji vəziyyətini müəyyən edən ekoloji amillər hesabına baş verir. Buna görə də ərazilərin ekosistem tədqiqi zamanı torpaq-bitki, torpaq-bioloji, geokimyəvi, geofiziki və torpağın vəziyyətini müəyyən edən digər amil və parametrlərin kompleks şəkildə öyrənilməsi tələb olunur. Bu baxımdan Qanıx-Əyriçay vadisinin torpaq-bitki komplekslərinin tədqiqi zamanı torpaq-ekoloji səciyyənin verilməsi üçün torpaq tədqiqatlarının aparılması zərurəti meydana çıxmışdır.

## Tədqiqatın obyekti və metodikası

Tədqiqat obyekti kimi Qanıx-Əyriçay vadisinin torpaqları götürülmüşdür. Ümumi sahəsi 308739 ha təşkil edir. Çöl torpaq tədqiqatları zamanı götürülmüş torpaq nümunələrinin aşağıdakı metodikalar üzrə fiziki-kimyəvi analizləri aparılmışdır: qranulometrik tərkib-Kaçinskiyə görə; hiqroskopik nəmlik-termiki üsulla; tam su çəkimi-D.İ.İvanov üsulu ilə; ümumi humus-İ.V.Tyurin üsulu ilə; umumi azot-Kyeldal üsulu ilə; ümumi fosfor-A.M.Meşeryakov üsulu ilə; mühitin reaksiyası-pH metrlə; karbonatlıq-kalsimetrlə təyin edilmişdir [9].

## Təhlil və müzakirə

Qanıx-Əyriçay vadisinin torpaq örtüyü H.Ə.Əliyev [8], Q.Ş.Məmmədov [7], M.P.Babayev [1,2], V.H.Həsənov [3, 4, 5], A.Ə.Xəlilova [6] və b. tərəfindən ətraflı öyrənilmişdir.

Apardığımız tədqiqatların məqsədinə uyğun ərazinin bitki örtüyünün altında inkişaf etmiş torpaqların öyrənilməsi ilə əlaqədar olaraq qarşıya qoyulmuş vəzifələri yerinə yetirmək üçün 2014-2015-ci illər ərzində ərazidə çöl tədqiqatları aparılmışdır. Ərazinin torpaq örtüyü haqqında məlumatlar toplanılarkən AMEA Torpaqşünaslıq və Aqrokimya İnstitutunun fondundan və akad. M.P.Babayevin rəhbərliyi altında tərtib edilmiş "Böyük Qafqazın cənub hissəsinin müasir torpaq xəritəsi"ndən (M 1:100000, 2017) istifadə edilmişdir [2]. Bu xəritə əsasında "Qanıx-Əyriçay vadisinin torpaq xəritə-sxemi" hazırlanmış, ərazidə yayılmış topaq yarımtip və növmüxtəlifliklərinin sahəsi hesablanmışdır.

"Qanıx-Əyriçay vadisinin torpaq xəritə-sxemi"nin legendasına əsasən ərazidə 8 torpaq tipi, 47 torpaq yarımtip və növmüxtəliflikləri yayılmışdır. Xəritə-sxemin legendasına əsasən torpaqların sahəsi bizim tərəfimizdən hesablanmışdır: 1. mədəniləşmiş dağ – qara- 819 ha ( 0,26%); 2. dağ - qəhvəyi-çəmən - 38166 ha (12,36%); 3.qonur dağ-meşə - 3370 ha (1,09%); 4.dağ-qəhvəyi- 63036 ha (20,42%); 5. allüvial çəmən-meşə- 72965 ha (23,64%); 6. allüvial-çəmən- 81120 ha (26,27%); 7.çəmən-bataqlı-9945 ha (3,22%); 8.çəmən-31630 ha (10,25%); 9.torpaq kompleksləri-7688 ha (2,49%).

Qanıx-Əyriçay vadisi ərazisində yayılmış torpaqların tip və yarımtiplər üzrə paylaşdırılması, torpaq balansında tutduqları yerlər aşağıdakı diaqramda göstərilmişdir (şəkil 1). Diaqramdan göründüyü kimi torpaq ehtiyatları tip və yarımtiplər

üzrə qeyri-bərabər paylanmışdır. Tədqiqat ərazisində ən çox yayılmış torpaqlar allüvial-çəmən torpaqlardır, ümumi sahənin 26,27%-ni təşkil edir. Tədqiqat obyektində yayılmasına görə 2-ci yeri tutan allüvial-çəmən-meşə torpaqlar ümumi sahənin 23,64%-ni təşkil edir (4212,58 ha).




***Şəkil . Qanıx-Əyriçay vadisinin torpaq örtüyü:***

***1.mədəniləşmiş dağ – qara; 2. dağ - qəhvəyi-çəmən; 3. qonur dağ-meşə; 4. dağ-qəhvəyi; 5. allüvial çəmən-meşə; 6. allüvial-çəmən; 7.çəmən- bataqlı; 8. çəmən; 9. torpaq kompleksləri.***

Məqalədə Qanıx-Əyriçay vadisində ən geniş yayılmış allüvial-çəmən və allüvial-çəmən-meşə torpaqların çöl, kameral-laboratoriya tədqiqatlarının, ədəbiyyat və fond materiallarının nəticələrinə əsaslanan münbitlik səciyyəsi verilir.

**Allüvial-çəmən torpaqlar.** Allüvial-çəmən torpaqlar Alazan çayı boyunca 150-300 m hündürlükdə və vadinin mərkəzi hissəsində yayılaraq sahəsinə görə 1-ci yeri tutur- 81120 ha. Tədqiqat obyektində bu torpaqların ən çox yuyulmuş allüvial-çəmən və karbonatlı allüvial-çəmən yarımtipləri, suvarılan, şoranlı, çaydaşlı, təbəqəli zəif inkişaf etmiş növləri yayılmışdır. Bu torpaqlar intrazonal torpaqlar olaraq inkişafı və yayılması zonal xüsusiyyətləri ilə əlaqədar olmuşdur. Onlar dominant yarımsəhra və intrazonal düzən-meşə landşaftları fonunda formalaşmışlar [8].

Bu ərazidə çəmən-meşə torpaqların formalaşması, inkişafı səthi və qrunt sularının hesabına torpağın üst qatında yaranan rütubət izafiliyi hesabına baş verir, bu zaman yağıntılar əsas rol oynamır [3]. Allüvial-çəmən torpaqları qumdaşıları, gilli və ya çınqıllı müasir gətirmələr üzərində 1-3 m dərinlikdə yerləşən qrunt sularının təsiri altında sıx ot və tək-tək ağaclar yayılan sahələrdə inkişaf etmişlər.

Mexaniki tərkibin və narın-dənəvari struktur qatının qalınlığının relyef şəraitindən asılı olaraq geniş hədd daxilində dəyişməsi əsas morfoloji əlamətlərdəndir. Tədqiqat obyektində mikrorelyefdən və allüvial-prolüvial çöküntülərin xarakterindən asılı olaraq allüvial-çəmən torpaqların növmüxtəliflikləri yayılmışdır [5]. Bu torpaqların zəif inkişaf etmiş laylı növləri ərazinin mikroçökəkliklərində qumsal-gillicəli karbonatsız allüvial çöküntülər üzərində formalaşmışlar. Narın torpaq qatının qalınlığı 0,8-1,5 m arasında dəyişməklə kəskin laylı qranulometrik tərkibə malikdir [2].

Şəki rayonu ərazisində Əyriçayın terrasında rütubətli taxıllı-müxtəlifotlu çəmən bitkiliyi altında formalaşmış allüvial-çəmən torpaqlarda qoyulmuş kəsimin analizlərinin nəticələri aşağıda verilir. Allüvial-çəmən torpaqların üst qatında humusun miqdarı 2,44% təşkil edərək, aşağı qatlara doğru tədrici dəyişmə müşahidə edilir-0,94%. Humusun tərkibi adətən humat və fulvat-humat tiplidir. Fulvoturşuların miqdarının humin turşularına nisbətən artması suvarma və şorakətləşmənin təsiri altında baş verdiyi hesab edilir. Ümumi azotun miqdarı adətən humusun miqdarına uyğun şəkildə dəyişir və üst qatda (19 sm) onun miqdarı 0,16% təşkil etmişdir.

Ədəbiyyat mənbələrinə əsasən bu torpaqlar münbit torpaqlar olub 1 m-lik qatda humus ehtiyatı 145 t/ha, azot ehtiyatı (0-50 sm) 9-10 t/ha, fosfor ehtiyatı 8 t/ha, kalium ehtiyatı 90 t/ha təşkil edir. Bu torpaqlar udulmuş əsaslarla nisbətən zəif təmin olunmuşlar: 18,20-24,50 mq-ekv [2].

Tədqiqat ərazisinin allüvial-çəmən torpaqların udulmuş əsaslarlarla təminatı kafi dərəcədədir; onların tərkibində əsasən $Ca^{2+}$, sonra isə $Mg^{2+}$ üstünlük təşkil edir. Udulmuş əsasların tərkibində kalsiumun miqdarı üst qatlarda aşağı qatlara nisbətən kifayət qədər yüksək olur. Torpaq mühitinin reaksiyası neytral-zəif qələvili olaraq PH-7,35 təşkil edir və aşağı qatlara doğru qələvilik artır (pH-7,77) (cədvəl 1). Torpaq profilinin morfoloji təhlili zamanı karbonatlıq qeyd olunmamışdır.

Ərazidə adətən allüvial-çəmən torpaqların qranulometrik tərkibinə görə çaydaşılı qumlu, qumsal, həm də gilli və ağır gillicəli növmüxtəliflikləri geniş yayılmışdır. Ədəbiyyat mənbələrindən də bəllidir ki, şorlaşmış və şorakətləşmiş torpaqların qranulometrik tərkibi digərlərinə nisbətən daha ağır olur [7]. Tədqiqat ərazisində yayılmış allüvial-çəmən torpaqlarda su çəkimi analizinin nəticələrinə nəzər salsaq görürük ki, mexaniki tərkibinə görə əsasən ağır gillicəli və gilli torpaqlardır və aşağı qatlara doğru gilləşmə artır (<0,01-55,84%) (cədvəl 2).

Cədvəl 1
**Allüvial-çəmən torpaqların aqrokimyəvi analizinin nəticələri**

| Kəsimin nömrəsi | Dərinlik (sm) | pH | Humus% | Azot | | Fosfor | | Kalium | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | Ümumi% | Udulmuş mq/kq N/$NH_4$ | Ümumi% | Mütəhərrik, mq/kq | Ümumi% | Mübadilə olunan, mq/kq |
| 3 | 0-19 | 7,35 | 2,44 | 0,159 | 12,07 | 0,141 | 32,50 | 2,66 | 140,98 |
| | 19-36 | 7,66 | 2,39 | 0,131 | 4,31 | 0,122 | 26,67 | 2,41 | 102,42 |
| | 36-63 | 7,69 | 2,35 | 0,103 | 3,45 | 0,102 | 23,33 | 2,05 | 96,40 |
| | 63-84 | 7,71 | 1,50 | 0,084 | 2,59 | 0,085 | 18,89 | 1,63 | 90,37 |
| | 84-120 | 7,77 | 0,94 | 0,065 | 1,72 | 0,061 | 17,78 | 1,41 | 60,25 |

Cədvəl 2
**Allüvial-çəmən torpaqlarda su çəkimi analizinin nəticələri**

| Kəsimin nömrəsi | Dərinlik | Mexaniki tərkib% | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | 1-0,25 | 0,25-0,05 | 0,05-0,01 | 0,01-0,05 | 0,005-0,001 | <0,001 | <0,01 |
| 3 | 0-19 | 0,25 | 18,59 | 25,32 | 22,36 | 18,40 | 15,08 | 55,84 |
| | 19-36 | 0,44 | 21,64 | 24,56 | 21,64 | 17,52 | 14,20 | 53,36 |
| | 36-63 | 0,29 | 17,83 | 25,40 | 22,32 | 19,28 | 14,88 | 56,48 |
| | 63-84 | 0,33 | 14,79 | 26,36 | 24,12 | 18,24 | 16,16 | 58,52 |
| | 84-120 | 0,31 | 17,85 | 24,48 | 22,84 | 18,76 | 15,76 | 57,36 |

Tədqiqat obyektimizdə gipsli-duzlu süxurlar üzərində formalaşmış allüvial-çəmən torpaqların şoranlı növ müxtəlifliklərinə rast gəlinir. Bizim tərəfimizdən bu torpaqların duz tərkibi öyrənilmiş və məlum olmuşdur ki, aşağı qatlara doğru, məxsusən torpaqəmələgətirici süxurlarda quru qalığın miqdarı artır (0,18-0,41%) və buna görə də bu torpaqlar dərindən şorlaşmaya məruz qalmışlar (cədvəl 3).

Cədvəl 3
**Allüvial-çəmən torpaqlarda quru qalığın miqdarı**

| Kəsimin nömrəsi | | Dərinlik (sm) | EC duzluluq (d/mS) | KCL mq/kq | Quru qalıq % | NaCl mq/kq |
|---|---|---|---|---|---|---|
| 3 | | 0-19 | 0,68 | 0,095 | 0,182 | 0,089 |
| | | 19-36 | 1,15 | 0,156 | 0,303 | 0,150 |
| | | 36-63 | 1,73 | 0,233 | 0,326 | 0,229 |
| | | 63-84 | 1,60 | 0,227 | 0,445 | 0,223 |
| | | 84-120 | 1,53 | 0,209 | 0,408 | 0,203 |

**Allüvial çəmən-meşə torpaqlar.** Allüvial çəmən-meşə torpaqlar Qanıx və Əyriçayın çay terraslarında və yataqətrafı çökəkliklərdə, quraq-mülayim isti iqlim şəraitində allüvial süxurlar üzərində formalaşmışlar. Balakən-Şəki ərazisində geniş yayılaraq ümumi sahəsi 72965 ha-dır və tədqiqat ərazisində yayılmasına görə 2-ci yeri tutur (23,64%). Ərazidə allüvial çəmən meşə torpaqların tipik və yuyulmuş yarımtiplərinin qleyli, qleyvari və çaydaşlı növmüxtəliflikləri geniş yayılmışdır ki, onların da işərisində çaydaşlı allüvial-çəmən-meşə torpaqlar üstünlük təşkil edir [4].

Cədvəl 4
**Allüvial çəmən-meşə torpaqların əsas tərkib hissələri (mütləq quru torpaqda, %-lə)**

| Kəsim №-si | Dərinlik, sm | Nəmlik, % | Humus, % | Azot,% | $CO_2$,% | $CaCO_3$,% | pH |
|---|---|---|---|---|---|---|---|
| 2 | 0-13 | 4,71 | 4,73 | 0,27 | 1,69 | 3,85 | 7,3 |
| | 13-31 | 4,45 | 3,05 | 0,21 | 2,63 | 5,98 | 7,1 |
| | 31-62 | 4,20 | 2,85 | 0,18 | 3,76 | 8,51 | 7,2 |
| | 62-87 | 3,94 | 1,16 | 0,14 | 3,57 | 8,11 | 7,3 |
| | 87-124 | 4,05 | 0,94 | 0,12 | 2,82 | 6,40 | 7,4 |

Cədvəl 5.
**Allüvial çəmən-meşə torpaqların mexaniki tərkibi analizinin nəticələri (mütləq quru torpaqda, %-lə)**

| Kəsim №-si | Dərinlik, sm | Hissəciklərin ölçüsü, mm, % | | | | | | <0,01 mm, % |
|---|---|---|---|---|---|---|---|---|
| | | 1-0,25 | 0,25-0,05 | 0,05-0,01 | 0,01-0,005 | 0,005-0,001 | <0,001 | |
| 2 | 0-13 | 0,69 | 25,57 | 22,61 | 18,09 | 17,76 | 15,28 | 51,13 |
| | 13-31 | 0,51 | 23,37 | 21,14 | 20,58 | 18,01 | 16,39 | 54,98 |
| | 31-62 | 0,94 | 27,24 | 24,80 | 17,70 | 16,21 | 13,11 | 47,02 |
| | 62-87 | 0,40 | 21,93 | 19,82 | 22,10 | 19,73 | 16,02 | 57,85 |
| | 87-124 | 1,14 | 40,14 | 18,60 | 14,28 | 13,10 | 12,74 | 40,12 |

Bu torpaqların formalaşmasında əsas rolu çayların lilli-qumlu gətirmələri oynayır. Qrunt və səthi suların izafiliyi nəticəsində torpaq profilində aşağı qatların bataqlaşması baş verir, belə sahələrdə hidrofit meşə və ot bitkiliyi güclü inkişaf edir. Düzən meşələrin yaxşı işıqlanması və əlverişli hidrotermiki rejim şəraitində meşə döşənəyinin intensiv parçalanması baş verir [6].

Cədvəl 6.
**Allüvial çəmən-meşə torpaqlarda udulmuş əsasların miqdarı (mütləq quru torpaqda)**

| Kəsim №-si | Dərinlik, sm | Udulmuş əsaslar, mq.ekv-lə | | | Udulmuş əsasların cəmi mq.ekv-lə | Udulmuş əsasların cəmindən % | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | $Ca^{+2}$ | $Mg^{+2}$ | $Na^{+}$ | | $Ca^{+2}$ | $Mg^{+2}$ | $Na^{+}$ |
| 2 | 0-13 | 20,00 | 11,00 | 0,70 | 31,70 | 63,09 | 34,70 | 2,21 |
| | 13-31 | 18,50 | 9,00 | 0,90 | 28,40 | 65,14 | 31,69 | 3,17 |
| | 31-62 | 16,50 | 9,50 | 1,00 | 27,00 | 61,11 | 35,19 | 3,70 |

Allüvial çəmən-meşə torpaqların

morfoloji təsvirindən aydın olur ki, bu torpaqlara az miqdarda meşə döşənəyi, kövrək çim qatı, profilin boz rəngi, zəif xırda topavari struktur, yüngülgillicəli mexaniki tərkib, karbonatlıq, səthdən qaynama, yüksək rütubətlilik xasdır [7]. Tədqiq olunan torpaqlarda humusun miqdarı 0,94-4,73% olub, aşağı qatlara doğru azalır, çürüntülü-humus maddəsinin miqdarı ilə əlaqədar azotun miqdarı 0,12-0,27% qədərində dəyişilir [2].Karbonatlarla zəngin olan allüvial-delüvial gətirmələr bu torpaqların profilini karbonatlarla orta dərəcədə zənginləşdirmişdir, çay kənarlarında, düzənliyin çökək hissələrində yayılmış torpaqlarda karbonatların miqdarı nisbətən azdır: 3,85-6,40%. Allüvial çəmən-meşə torpaqların torpaq məhlulunun reaksiyasına karbonatlılığın səviyyəsi təsir göstərərək neytral və zəif qələvi xassəli etmişdir: 7,1-7,4 (cədvəl 4). Allüvial çəmən-meşə torpaqlar yüngül və orta gillicəli mexaniki tərkibə malik olaraq profil boyu gil hissəciklərinin miqdarı 40,12-54,98%, lil hissəciklərinin miqdarı 12,74-16,39% olmuşdur (cədvəl 5). Orta və ağır gillicəli mexaniki tərkibə malik allüvial çəmən-meşə torpaqlarda $Mg^{2+}$ olduğu müəyyən edilmişdir. miqdarı 7-11 mq-ekv qədər artır. Tam su çəkimi analizinin nəticələrinə görə (0,13-0,19%) bu torpaqlar demək olar ki, şorlaşmamışlar, bu isə vadidə torpaqəmələ gətirən süxurların şorlaşmamış olması ilə əlaqədardır.Qanıx-Əyriçay vadisində yayılmış düzən çəmən-meşə torpaqlarında palıd-vələs meşələrinin üzvi-mineral maddələrinə olan yüksək tələbatı nəticəsində bu torpaqların uducu kompleksinin əsaslarla təminatı orta səviyyədədir: 31,70-27,00 mq-ekv. Udulmuş əsasların tərkibində udulmuş $Ca^{2+}$ miqdarı 18,5-20,0 mq-ekv olaraq aşağıya doğru azalır (cədvəl 6).**Nəticə**Qanıx-Əyriçay vadisinin allüvial-çəmən torpaqları əlverişli torpaq-ekoloji şəraitə malik olması ilə əlaqədar müxtəlif kənd təsərrüfatı bitkiləri altında geniş istifadə olunurlar. Ərazidə bu torpaqların yuyulmuş və karbonatlı yarımtipləri, suvarılan, şoranlı, çaydaşlı, təbəqəli zəif inkişaf etmiş növləri yayılmışdır. Allüvial-çəmən-meşə torpaqlar intrazonal torpaqlar olaraq ərazidə qleyli, qleyvari və çaydaşlı növmüxtəliflikləri geniş yayılmışdır. Aparılmış tədqiqatların nəticələrinə görə allüvial-çəmən-meşə torpaqların daha yüksək münbitliyə malik

**ƏDƏBİYYAT**

1. Babayev M.P., Cəfərov Ə.M., Cəfərova Ç.M., Hüseynova S.M., Qasımov X.M., Böyük Qafqazın müasir torpaq örtüyü. Bakı: Elm, 2017, 345 s. 2.Babayev M.P., Həsənov V.H., Cəfərova Ç.M., Hüseynova S.M. Azərbaycan torpaqlarının morfogenetik diaqnostikası, nomenklaturası və təsnifatı. Bakı: Elm, 2011, 448 s. 3.Həsənov V.H. Aərbaycan çay subasarları bataqlı torpaqlarının morfogenetik diaqnostikası və nomenklaturası. prof. M.R. Abduyevin 85 illik yubileyinə həsr olunmuş "Azərbaycan torpaqları: genezis, cografiya, meliorasiya, səmərəli istifadə və ekologiya" Beynəlxalq elmi konfransın əsərlər toplusu.Bakı, 8-12 iyun, h. II, Bakı, Elm, 2012, s..220-224. 4.Həsənov V.H. Azərbaycanın quru və yarımrütubətli subtropik zonalarında allüvial-hidromorf torpaqların təkamülü. Torpaqşünaslıq və Aqrokimya, cild 20, №1, 2011, s.33-43. 5.Həsənov V.H., Xəlilova A.Ə. Alazan vadisi torpaq örtüyü strukturuna və torpaqların diaqnostik göstəricilərinə relyef şəraitinin təsiri. Azərbaycan Aqrar Elmi Jurnalı. Bakı, 2004, №1-3, s.52-55. 6.Xəlilova A.Ə. Alazan vadisi torpaq örtüyünün strukturları və onların aqroekoloji qiymətləndirilməsi. K.t.e.n. alimlik dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı, Bakı, 2004, 19 s. 7.Məmmədov Q.Ş. Torpaqşünaslıq və torpaq coğrafiyasının əsasları. Bakı, Elm, 661 səh. 8.Алиев Г.А. Почвы Большого Кавказа. Том 2, Элм, 1994, 430 с. 9.Аринушкина Е.В. Руководство по химическому анализу почв. Изд-во Московского университета, 1970, 488 с. 10.Гасанов В.Г. Террасовые почвы Алазанской долины и их сельскохозяйственное использование. Автореф. канд.дис-ции. Баку, 1967, 28 с.

**Характеристика плодородия аллювиально-луговых и аллювиально-лугово-лесных почв Ганых-Айричайской долины**

**Г.Р.Сарыева**

Учитывая благоприятные почвенно-экологические условия аллювиально-луговые почвы Ганых-Айричайской долины широко используются под различные сельскохозяйственные культуры. Здесь распространены выщелоченные и карбонатные подтипы, орошаемые, засоленные, галечниковые, слоистые и слаборазвитые виды этих почв. Аллювиально-лугово-лесные земли широко распространены в долине как интразональные почвы, встречаются глеевые и галечнивовые разновидности. По результатам исследования было установлено, что аллювиально-лугово-лесные почвы обладают более высокой плодородией.

***Ключевые слова:*** *Ганых-Айричайская долина, гумус, низинные леса, плодородие почв*

**Characteristics of the fertility of alluvial-meadow and alluvial-meadow-forest soils of the Ganikh-Agrichai valley**

**G.R.Sarıyeva**

Taking into account favorable soil and ecological conditions, the alluvial-meadow soils of the Ganikh-Agrichai valley are widely used for various agricultural crops. Leached and carbonate subtypes, irrigated, saline, pebble, layered and underdeveloped species of these soils are widespread here. Alluvial-meadow-forest lands are widely distributed in the valley as intrazonal soils, there are gley and pebble varieties. According to the results of the study, it was established that alluvial-meadow-forest soils have higher fertility.

**Key words:** *Ganikh-Agrichai valley, humus, lowland forests, fertility of soils.*

***E-mail: maharramova.gunel@mail.ru***